# Mərhəmətli, Rəhmli Allahın adı ilə!

## Ön söz

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edir, Onu köməyə çağırır, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

«Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!»[1]

«Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir.»[2]

«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar.»[3]

Uca Allah məxluqatı yaratdı ki, Onu tanısınlar və Ona ibadət etsinlər.[4] Eləcə də O Öz böyüklüyünə sübutlar gətirdi ki, Ona itaət etsinlər. Həmçinin Ona qarşı

---

[1] Ali İmran, 102.
[2] ən-Nisa, 1.
[3] əl-Əhzab, 70-71.
[4] əz-Zariyat, 56.

çıxanlar üçün hazırlanmış cəzanın ağırlığını və əzab yerini onlara təsvir etdi ki, Ondan qorxsunlar Onun əmrini yerinə yetirməyə tələssinlər, Ona məhəbbətini nümayiş etdirsinlər və Onu razı salsınlar, haram etdiyi, nifrət etdiyi və qadağan etdiyi şeylərdən uzaq olsunlar.

"Mömin kişilərlə mömin qadınlar bir-birinin dostlarıdır. Onlar *insanlara* yaxşı işlər görməyi buyurur, pis əməllərə qadağa qoyur, namaz qılır, zəkat verir, Allaha və Onun Elçisinə itaət edirlər. Allah onlara rəhm edəcəkdir. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir."[1]

## Dəstəmazla əlaqəli şəriət hökmləri

Qadının bəzənmək üçün istifadə etdiyi - dodaq boyası, krem, ənlik və başqa ləvazimatlar dəstəmazı və orucu pozmur.

Qadın uşağını yuyarkən dəstəmazı pozulmur.

Dırnaq boyası suyun dırnaqlara çatmasına mane olduğundan, belə halda alınan dəstəmaz qəbul deyil. Buna görə də dəstəmaz alarkən dırnağın üzərindən dırnaq boyasını təmizləmək lazımdır. Amma bu, dırnaq boyasından istifadə etməyin haram olmasına dəlalət etmir. Əksinə, qadın dırnaq boyasından istifadə edə bilər.

Dırnaq boyası çəkmək dəstəmazı pozmur.

Qadının fərcindən çıxan hava dəstəmazı pozmur. Çünki, bu hava pak yerdən çıxır. Lakin, arxadan çıxan hava nəcis yerdən çıxdığı üçün dəstəmazı pozur.

Övrət yerindən başqa, bədənin hər hansı bir yerindən çıxan qan, su və s. dəstəmazı pozmur.

[1] ət-Tovbə, 71.

## Qüsl ilə əlaqəli şəriət hökmləri

Qadın pollyusiya olarsa, ona qüsl almaq vacibdir. Bu halda bilməyərəkdən namaz qılan qadın qüsl edib namazını yenidən qılmalıdır.

Qadın cinsi əlaqədə olduqda, ondan məni gəlməsə belə qüsl almalıdır.

Qadın heyz, nifas, pollyusiya hallarında və cinsi əlaqədən sonra, qüsl alana qədər Qurandan başqa hər hansı bir dini kitab oxuya bilər. Bəzi alimlərin rəyinə görə toxunmamaq şərti ilə Quran da oxuya bilər.

Qadına qüsl etmək aşağıdakı hallarda vacib olur:

- Qadın heyz və nifasdan qurtardıqdan sonra.
- Pollyusiya və cinsi əlaqədən sonra.
- İslam dinini qəbul etdikdə və ya (şirk və ya küfr etməklə) İslam dinindən çıxdıqdan sonra, yenidən bu dinə qayıtdıqda.

## Təyəmmümlə əlaqəli şəriət hökmləri

Su olmadıqda, namazı yalnız aşağıdakı hallarda axır vaxtına qədər gecikdirmək olar:

1. Su tapılacağına əmin olduqda;
2. Su tapılacağına daha çox ehtimal olduqda.

Başqa üç hal da var ki, o hallarda namazı əvvəl vaxtında təyəmmümlə qılmaq lazımdır:

1. Suyun tapılmayacağına əmin olduqda;
2. Suyun tapılmayacağına daha çox ehtimal olduqda;

3. Suyun tapılıb-tapılmayacağına tərəddüd olduqda;

Bu hallarda namazı təyəmmümlə qıldıqdan sonra su tapılsa, namazı yenidən qılmaq lazım gəlmir.

## Məsh ilə əlaqəli şəriət hökmləri

Məshin şərtləri:

- Qadın corab və ona oxşar ayaq geyimlərini dəstəmazlı ikən geyinməlidir;
- Ayaq geyiminin üzərində nəcis olmamalı;
- Yalnız dəstəmaz aldıqda məsh etmək olar. Qüsl etdikdə isə ayaqlar yuyulmalıdır;
- Məshin müddəti məsh çəkilən vaxtdan başlayır və müsafir üçün üç gün (yəni, 72 saat), yerli sakin üçün isə bir gün (yəni, 24 saat) davam edir;

Ayaqlar yalın olduqda onları yumaq vacib, geyimli olduqda isə məsh çəkmək əfzəldir (yumaq da olar). Hər dəstəmaz üçün ayaq geyimlərini çıxarıb, ayaqları yumaq vacib deyil.

Nazik və ya deşiyi olan corabların üstünə məsh çəkmək caizdir.

Məsh çəkildikdən sonra, onun (müsafir üçün üç gün, yerli sakin üçün isə bir gün) müddətinin bitməsi dəstəmazı pozmur.

Məshi nə zaman etdiyinə şəkk edən insan yəqinliyə qayıtmalıdır. Məsələn: zöhr və ya əsr namazının vaxtında məsh çəkdiyinə şəkk edirsə, məshin əsr namazının vaxtında alınmasını yəqin bilməlidir.

Qadın məsh etdikdən sonra corabını çıxarsa, dəstəmazı pozulmaz, lakin məshin davamlılığı öz hökmünü itirir. Bu halda növbəti dəstəmaz zamanı ayaqlar da yuyulmalıdır.

Dəstəmaz və ya qüsl aldıqda yaranın üzərindəki cunanın, gipsin və başqa bu kimi müalicəvi vasitələrin üzərinə məsh çəkmək olar. Məshin bu növü üçün vaxt məhdudiyyəti yoxdur. Belə ki, yara sağalana qədər məsh çəkmək olar. Həmçinin ayaq geyimlərinin üzərinə çəkilən məshin şərtlərinin olması vacib deyil.

Yaranın üstü açıq olduğu təqdirdə aşağıdakı hökmlər vacib olur:

- Dəstəmaz və ya qüsl etdikdə, su yaraya zərər toxundurmazsa, yaranın üzərini yumaq vacibdir.
- Dəstəmaz və ya qüsl etdikdə, su yaraya zərər toxundurarsa, o yerin üzərindən məsh çəkmək vacibdir.
- Dəstəmaz və ya qüsl etdikdə su ilə yumaq və ya məsh çəkmək yaraya zərər toxundurarsa, o yer üçün təyəmmüm olunur. (Yəni dəstəmaz və ya qüsl etdikdən sonra təyəmmüm də edilir).

Məsh yalnız qüsl və ya dəstəmaz aldıqda olur, təyəmmüm etdikdə isə məshə ehtiyac qalmır.

## Fitri sünnələr

Dırnaqları, qoltuq altındakı və qasıqdakı tükləri qırx gündən artıq saxlamaq Peyğəmbərin ﷺ sünnəsinə ziddir.

Qadın kişiyə və kafir qadınlara oxşamamaq şərti ilə saçını qısalda bilər. Keçəl etmək isə haramdır. Amma zərurət halında bunu edə bilər.

Qadınların parik taxması haramdır. Yalnız xəstə qadın – saçı tökülmüş və ya anadangəlmə keçəl zəruri hallarda bundan istifadə edə bilər.

Saçı tam qara boya və ya ağ boya ilə rəngləmək haramdır. Başqa rənglə isə kafir qadınların saçına oxşatmamaq şərti ilə rəngləmək olar. Qadın yuxarıdakı şərtlərlə saçının bəzi yerini rəngləyə bilər.

Qaş almaq (qopartmaq, qırxmaq, qısaltmaq) haramdır. Peyğəmbər ﷺ qaş alanı və aldıranı lənətləmişdir.

Qadın öz saçını istədiyi formaya sala bilər.

Qadına ayaqda, qolda, üst dodaqda və üzdə çıxan tükləri təmizləmək caizdir.

Bədəndə şəkil döymək və ya döydürmək haramdır.

## Heyz ilə əlaqəli şəriət hökmləri

Heyz – qadının uşaqlığından hər ayın müəyyən günlərində çıxan qandır.

Bu halda olan qadına namaz qılmaq, oruc tutmaq, cinsi əlaqəyə girmək, Kəbəni təvaf etmək, (bəzi alimlərin rəyinə görə) Quran oxumaq və ona toxunmaq haramdır.

Həddi-buluğa çatan və oruc tutmağın vacib olduğunu bilən hər bir müsəlman qadına oruc tutmaq vacibdir. Bu halda oruc tutmayan qadın, buraxdığı orucların qəzasını tutmalıdır.

Qadının həddi-buluğa çatmasını aşağıdakı hallardan biri ilə bilmək olar:

- Heyz qanının gəlməsi;
- Pollyusiya halı;

- Övrət yerinin tüklənməsi;

Hamilə qadından adəti üzrə ayın müəyyən vaxtı qan gələrsə, bu, heyz qanından sayılır.

Heyz qanının qarşısını almaq üçün istifadə olunan dərmanlar haram deyil. Lakin ziyanı çox olduğundan bundan istifadə etmək bəyənilmir.

Qadın heyzdən təmizləndikdən sonra fərcindən çıxan qan, sarı və ya bulanıq su, tər v s. heyz qanından sayılmır.

Qadın müalicəvi yolla heyz qanının gəlməsini tezləşdirərsə, bu qanın hökmü, adəti üzrə çıxan heyz qanının hökmü kimi sayılar.

Heyz qanı gələn günlərdə təmizlik məqsədilə çimmək caizdir.

Heyz qanı hər ay gəldiyi müddətdən çox və ya az da gələ bilər. Bu halda gələn qan heyz qanından sayılır.

Heyzli qadın utandığından (heyzli olduğunu bilməsinlər deyə) namaz qılıb, oruc tutarsa, tövbə etməlidir. Çünki, onun etdiyi bu əməl haramdır.

Heyzli qadın zəruri halda əzbərdən Quran oxuya bilər.

Bakirəliyini itirən qız qüsl etdikdən sonra fərcindən gələn qan yalnız dəstəmazı pozur.

Qadın namaz vaxtı girdikdən sonra heyz olarsa, həmin namazı qəza etmir.

## Nifas[1] ilə əlaqəli şəriət hökmləri

Nifas halında olan qadınla cinsi əlaqəyə girmək haramdır.

[1] Nifas – qadının doğuşdan sonrakı halıdır.

Nifas halı və qadına bu halda vacib olan şeylər:

- Nifas qanı kəsilən kimi qadın qüsl edib, ona vacib olan ibadətləri yerinə yetirməlidir.

Qadın nifas və heyz hallarında həyat yoldaşı ilə cinsi əlaqədən başqa, istədiyi hərəkəti edə bilər.

Hamilə qadın uşaqdan azad olmazdan əvvəl fərcindən çıxan qan nifas qanından sayılmır. Lakin bu qan qadının adəti üzrə gələn heyz qanının vaxtına düşərsə, qadın təmizlənənə qədər qadağan olunanlardan çəkinməlidir.

Qadının bətnindəki uşaq vaxtından tez düşdüyü təqdirdə gələn qanın iki hökmü var:

1. Uşaq 80 gündən tez düşübsə, gələn qan nifas qanından sayılmır. Bu halda qadın ona vacib olanları yerinə yetirməlidir.
2. Uşaq 80 gündən sonra düşübsə, gələn qan nifas qanından sayılır. Bu halda qadın ona vacib olanları tərk etməlidir.

Qadın 80 günün tamam olub-olmadığına şəkk edirsə, ehtiyat üçün qüsl almalıdır.

## Hicabın şərtləri

- Əl və üzdən başqa bütün bədən üzvləri örtülməlidir;
- Hicab bərbəzəkli olmamalıdır;
- Dar və ya ətirlənmiş olmamalıdır;
- Kişilərin və ya kafir qadınların geyiminə oxşamamalıdır;
- Şəffaf və ya diqqəti cəlb edən paltar olmamalıdır;

Qadın həddi-buluğa çatan oğulluğunun yanında olduqda övrət yerini örtməlidir. Həmçinin, qızlığa götürülmüş qız həddi-buluğa çatdıqdan sonra öz vəlisinin yanında əl və üz istisna olmaqla bütün övrət yerlərini örtməlidir.

## Namazla əlaqəli şəriət hökmləri

Qadının evində qıldığı namaz məsciddə qıldığı namazdan əfzəldir. Bayram namazlarını isə, bayram namazı qılınan yerdə qılmaq vacibdir.

Namaz qılarkən qadının əl və üzündən başqa bütün bədən üzvləri görünməməlidir.

Dar və ya şəffaf geyimdə namaz qılmaq olmaz.

Qadın namazda kişilərə imam dura bilməz, qadınlar üçün isə durması caizdir. Kişilərdən fərqli olaraq, imam duran qadın qadınlarla bir cərgədə durmalıdır.

Namaz hərəkətlərinin heç birini imamdan tez etmək olmaz.

Təravih namazında imamın arxasında duran kimsəyə – Qurana baxaraq imam oxuduğu ayələri izləmək olmaz.

Qadın, yanında naməhrəm olmadığı təqdirdə sübh və gecə namazlarında, məğrib və işa namazlarının birinci iki rükətində Fatihəni və ardı ilə oxuduğu surələri uca səslə oxuya bilər.

Qadının arxa cərgədə qıldığı namazı ön cərgədə qıldığı namazından daha əfzəldir. Qadınlarla kişilər arasında pərdə olduğu təqdirdə birinci cərgə daha əfzəl sayılır.

Namazı bilərəkdən vaxtından gec qılmaq olmaz. Səfər, müharibə, təhlükə və başqa bu kimi üzrlü səbəblərə görə namazı axır vaxtına qədər gecikdirmək və ya iki namazı (zöhrlə əsri və məğriblə işa namazlarını) birləşdirib qılmaq olar.

Nəcisli paltar, ayaqqabı və s. ilə bilə-bilə namaz qılanın namazı batil olur. Paltarının və ayaqqabısının nəcisə batdığını bilməyib namaz qılan kimsəyə isə namazı yenidən qılmaq lazım deyil.

Qadın namaz əsnasında paltarında və ya ayaqqabısında nəcis olduğunu bilsə, həmin geyimi namaz əsnasında çıxarıb, namazı davam etməlidir. Paltarın çıxarılması qadının övrət yerinin açılmasına səbəb olarsa, namazı tərk edib paltarını dəyişməli və namazı yenidən qılmalıdır.

Məscidin yaxınlığında yaşayan qadın evində namaz qılmaq üçün məsciddə verilən iqaməni gözləməyib, azan oxunan kimi namazını qıla bilər.

Cərrahiyyə əməliyyatı zamanı buraxılmış bir neçə namazın qəzası qılınmalıdır. Cərrahiyyə əməliyyatından öncə, məsələn: zöhr namazının vaxtında, zöhrlə əsr namazını və məğrib namazının vaxtında, məğriblə işa namazını birləşdirib qılmaq olar.

Quran oxuyan qadının "səcdə" ayəsinə çatdıqda, səcdə etmək üçün baş, ayaq və qollarını örtməsi vacib deyil. Çünki, namazdakı səcdə ilə bu səcdənin hökmü fərqlidir.

Qəsdlə buraxılan namazların qəzası qılınmır. Onun üçün yalnız tövbə etmək və gələcək namazlarda davamlı olmaq lazımdır.

Qadın gün batmamışdan əvvəl heyzdən təmizlənərsə, əsr namazını, gecənin yarısından əvvəl heyzdən təmizlənərsə, işa namazını qılmalıdır.

Qadın hansı namazın vaxtında heyzdən təmizlənərsə, yalnız o namazı qılmalıdır.

Qadın hər hansı bir namazın vaxtında heyz olub o namazı qılmayıbsa, təmizləndikdən sonra onun qəzasını qılmamalıdır.

Xəstəliklə əlaqədar sidiyini və s. saxlaya bilməyən şəxs dəstəmaz alıb namazını qılmalı, namaz əsnasında ondan ifraz olunan şeyə görə namazını tərk etməməlidir.

## Orucla əlaqəli şəriət hökmləri

Heyz olarkən qadına oruc tutmaq haramdır.

Qadın heyz olması səbəbindən Ramazan ayında tutmadığı orucların qəzasını növbəti Ramazan ayına qədər tutmalıdır.

Orucu tərk edən heyzli qadın tərk etdiyi günlərin qəzasını tutmalıdır.

Uşaq əmizdirən və ya hamilə qadın buraxdığı orucların qəzasını başqa aylarda tutmalıdır.

Müsafirə və xəstəyə oruc tutmaq vacib deyil. Lakin sonrakı aylarda bunun qəzasını tutmalıdır.

Qəza oruclarını ardıcıl tutmaq vacib deyil.

Oruc tutan adam səfərdə cinsi əlaqəyə girə bilər.

Ramazan ayının başladığını bilməyib cinsi əlaqəyə girən hər bir şəxs tutmadığı oruca görə Ramazandan sonra bir gün qəza orucunu tutmalıdır. Bilərəkdən cinsi

əlaqəyə girən şəxs isə həm tövbə etməli, həm o günün əvəzinə bir gün qəza tutmalı, həm də cərimə olaraq ya altmış gün ardıcıl oruc tutmalı, ya altmış kasıbı yedirtməli ya da bir qul azad etməlidir.

Bayram günləri oruc tutmaq haramdır.

Ramazanda bilməyərək yemək, içmək və cinsi əlaqəyə girmək orucu pozmur.

Qusmaq orucu pozmur, lakin qəsdən özünü qusdurmaq həmin günün orucunu batil edir.

Ramazanda, cinsi əlaqədən başqa ərlə arvadın arasında olan, hər-hansı bir şəhvət hissi oyadan hərəkət orucu batil etmir. Lakin, bu halda məni ifraz olunmuşsa, oruc pozulur və bir gün qəza tutmaq vacib olur.

## Zəkat ilə əlaqəli şəriət hökmləri

Zəkat iki şərtlə vacib olur:

1. Miqdar (yəni şəriətin təyin etdiyi miqdara çatmalıdır);
2. Vaxt (yəni şəriətin təyin etdiyi vaxta çatmalıdır).

Qadına bəzənmək məqsədilə istifadə etdiyi qızıl əşyalarının zəkatını verməsi əfzəldir.

Qızılın zəkat miqdarı 85 qram, müddəti isə bir ildir. Yəni qızılın çəkisi 85 qram olduqdan sonra, üzərindən 1 il keçərsə, 1 ilin tamamında həmin miqdardan 2.5 % zəkat verilməlidir.

Zəkat malını toy etmək üçün istifadə etmək olmaz. Lakin, çox kasıb olana evlənmək üçün zəkat malından kömək etmək olar. Çünki, kasıblar zəkat verilən 8 sinif insanlardan biridir.

## Həcc ilə əlaqəli şəriət hökmləri

Qadına məhrəmsiz həcc etmək olmaz. Qeyd etmək lazımdır ki, məhrəmsiz həcc edən qadının həcci qəbul olur, lakin buna görə günah qazanır.

Qadın həcc günlərində heyz olsa, təvafdan başqa həccin bütün ərkanlarını, vaciblərini və sünnələrini yerinə yetirməli, qadağan olan şeylərdən çəkinməlidir. Heyzdən təmizlənib qüsl etdikdən sonra isə təvaf etməlidir.

"Vida təvafı" heyz və nifaslı qadından başqa, hər bir həcc edən müsəlmana vacibdir.

Ehramda olan qadına üzünü niqabla örtmək və əlinə əlcək taxmaq haramdır.

## Qadına məhrəm olanlar və onlarla əlaqəli şəriət hökmləri

Qadına məhrəm olan kişilər aşağıdakılardır: qadının atası, əmisi, dayısı, doğma və ögey oğlu, əri, doğma və süd qardaşı, qız və oğul nəvəsi, qardaşının və bacısının oğlu, ana və atanın dayısı və əmisi, qayınatası, kürəkəni və babası.

Qadın məhrəmin yanında başı, boynu, dirsəyinə qədər qolları, dizinə qədər ayaqları açıq gəzə bilər. Ər üçün isə heç bir məhdudiyyət yoxdur. Uca Allah möminləri vəsf edərək deyir: "O kəslərdir ki, öz cinsi orqanlarını *həmişə* qoruyurlar, zövcələri və sahib olduqları cariyələr istisnadır. Onlar *buna görə heç* qınanmazlar."[1]

[1] əl-Muminun, 5-6.

Dar və şəffaf geyimdə məhrəmin yanında olmaq haramdır.

Qadına, hicabda olsa belə naməhrəm ilə təklikdə qalmaq haramdır.

Qadın məhrəmi ilə hər hansı münasibətə görə öpüşə bilər. Amma şəhvət hissi ilə ərdən başqa hər hansı bir şəxsi öpmək haramdır.

Qadın naməhrəm kişi ilə yalnız zərurət halında danışa bilər. Digər məqsədlərlə danışmaq qadağandır.

Qadın ərindən qeyrisi ilə nazlana-nazlana danışmamalıdır. Uca Allah buyurur: "Əgər *Allahdan* qorxursunuzsa, *yad kişilərlə* nazlana-nazlana danışmayın, yoxsa qəlbində xəstəlik olan tamaha düşər. *Şəriətə* müvafiq qaydada danışın."[1]

Ayıb yerlərini naməhrəmdən gizlətməyən qadın böyük günah etmiş olur. Bu halda:

1. Hicabın vacibliyinə dəlalət edən ayə və hədisləri bildikdən sonra, hicabın vacib olduğunu inkar edən, ağlını şəriət qanunlarından üstün tutub onları bəyənməyən qadın kafir sayılır və tövbə etməmiş ölərsə, əbədi cəhənnəmlik olur.

2. Hicabın vacibliyini etiraf edib, bilərəkdən onu tərk edən isə fasiq sayılır. Axirətdə bu cür qadınların halı belə ola bilər;

- Ya Cəhənnəmdə cəzasını tam şəkildə çəkib sonra Cənnətə düşəcək;
- Və ya Cəhənnəmə atıldıqdan sonra, cəzasını axıra qədər çəkməmiş oradan çıxıb Cənnətə daxil olar;
- Yaxud da Allah onu elə ilk dəfədən bağışlayar.

---

[1] əl-Əhzab, 32.

Allaha asi olaraq yaradılmışlara itaət etmək olmaz. Əgər evin kişisi qadına hicab geyinməyi qadağan edərsə, ona itaət etmək olmaz.

Naməhrəmlə əllə görüşmək haramdır. Aişə (r.a) demişdir: "Rəsulullahın ﷺ əli qadın əlinə toxunmamışdır".

Qadının naməhrəm kişiyə şəhvətlə baxması haramdır. Uca Allah buyurur: "Mömin kişilərə de ki, *harama baxmayıb* gözlərini aşağı diksinlər və cinsiyyət üzvlərini *zinadan* qorusunlar. Bu, onlar üçün daha təmiz olar. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır. Mömin qadınlara da de ki, *harama baxmayıb* gözlərini aşağı diksinlər və cinsiyyət üzvlərini *zinadan* qorusunlar."[1] Peyğəmbər ﷺ demişdir: "Gözün zinası naməhrəmə şəhvətlə baxmaqdır."

Ətirlənib bayıra çıxmaq və ya evdə olanın yanında oturmaq haramdır. Peyğəmbər ﷺ demişdir: "Qadın məscidə getdiyi zaman ətirlənməməlidir."

Naməhrəmə sevgi məktubları yazmaq caiz deyil.

## Nikahın xüsusiyyətləri

Uca Allah buyurur: "Yetim qızlara qarşı ədalətli olmayacağınızdan qorxursunuzsa, onda xoşunuza gələn *halal* qadınlardan ikisi, üçü və dördü ilə evlənin. Əgər *o qadınlarla* ədalətlə dolanmayacağınızdan qorxursunuzsa, onda *onlardan* biri ilə və yaxud sahib olduğunuz cariyələrlə *kifayətlənin*. Bu, haqsızlıq etməməyə daha yaxındır."[2] Kişi evlənmək istədiyi qadına baxa bilər.

---

[1] ən-Nur, 30-31.
[2] ən-Nisa, 3.

Müsəlman yalnız müsəlmanla evlənməlidir. Lakin kitab əhlinin ismətli qadınları ilə də evlənmək olar. Uca Allah buyurur: "İsmətli mömin qadınlar da, sizdən əvvəl Kitab verilənlərin ismətli qadınları da, namuslu olub zinakarlıq etməmək və aşna saxlamamaq şərti ilə mehrlərini verdiyiniz təqdirdə sizə halaldır."[1]

Nikahın qəbul olması üçün aşağıdakı şərtlərin olması labüddür:

1) qadın tərəfdən vəlinin iştirak etməsi;
2) həmçinin iki müsəlman şahidin iştirak etməsi;
3) mehrin təyin olunması;
4) kişi tərəfdən vəlinin iştirak etməsi;

Kəbini kəsilən oğlanla qızın adı çəkilməlidir.

Həddi-buluğa çatmış qızı və ya dul qadını ərə vermək üçün onlardan izn almaq vacibdir.

## Mehrlə əlaqəli şəriət hökmləri

Kəbini kəsilən qadının mehrini vermək vacibdir. Uca Allah buyurur: "Qadınlara öz mehrlərini könül xoşluğu ilə verin!"[2]

Mehrin miqdarını kəbin kəsilən vaxt təyin edib, iki tərəfin razılığı ilə bir müddətdən sonra da vermək olar.

Qadın mehrin müəyyən hissəsini və ya hamısını ərinə bağışlaya bilər. Lakin, bu könül xoşluğu ilə (qadının razılığı ilə) olmazsa, ona mehrdən istifadə etmək haramdır. Uca Allah buyurur: "Qadınlara öz mehrlərini könül xoşluğu ilə verin! Əgər onlar öz xoşları ilə bundan

---

[1] əl-Maidə, 5.
[2] ən-Nisa, 4.

sizə bir pay versələr, onu nuşcanlıqla və halallıqla yeyin!"[1]

Qadın istədiyi qədər mehr tələb edə bilər. Lakin, lap çox istəmək bəyənilmir.

Mehri verilən qadını, onunla cinsi əlaqəyə girməzdən qabaq boşadıqda, verilən mehrin yarısını geri götürmək caizdir. İkinci yarısı isə qadının haqqıdır. Lakin istəsə öz haqqını belə (yəni, ikinci yarısını) ona qaytara bilər.

Kəbin kəsildikdən sonra qızla təklikdə söhbət etmək olar.

Nişanlanmamışdan əvvəl oğlanın elçi göndərmək istədiyi qızı görməməsi sonradan boşanmaya səbəb ola bilər. Əbu Hureyrənin rəvayət etdiyi hədisdə: "Bir kişi nişanlandığını peyğəmbərə ﷺ xəbər verir. Peyğəmbər ﷺ ondan: "Sən nişanlına baxdınmı?" – deyə soruşur. O deyir: "Yox, baxmadım". Peyğəmbər ﷺ ona əmr edərək deyir: "Get nişanlına bax!"[2]

Nişan üzüyünə aid heç bir dəlil yoxdur.

Peyğəmbər ﷺ kişinin nişanlı qıza elçi göndərməsini qadağan edib demişdir: "Sizdən biriniz müsəlman qardaşının nişanlısına elçi göndərməsin". Bu əməli edib qızla evlənən kəs günah qazanmış olsa da, kəsdiyi kəbin qanuni sayılır. Buna görə də müsəlman bacılarıma nəsihət edirəm ki, elçi gələnlərə razılıq verməzdən öncə ata, qardaş və başqa məhrəmləri ilə məsləhətləşsinlər. Peyğəmbərin ﷺ zamanında Qeysin qızı Fatiməyə (r.a.)

---

[1] ən-Nisa, 4.
[2] Muslim.

iki nəfər elçi gəlir. O gəlib Peyğəmbərdən ﷺ məsləhət istədikdə peyğəmbər ﷺ onlardan birinin xəsis, digərinin isə arvad döyən olduğunu ona xəbər verir. Sonra isə o qadına Usaməyə (r.a.) ərə getməyi məsləhət görür.

Qıza atasının izni olmadan ərə getmək olmaz. Ata isə qızını zorla onun istəmədiyi oğlana verməməlidir.

Qadının vəlisi olmadığı təqdirdə qazı onun vəlisi ola bilər.

Vəli yalnız qadının ata tərəfindən olmalıdır.

Yetim qızın icazəsi olmadan, onu ərə vermək olmaz.

Qızı zorla ərə vermək haramdır. Bu cür kəsilən kəbin isə batildir. Buna bilərəkdən şahidlik edənlər və qızın vəlisi günah qazanmış olur.

Məhkəmə zorla ərə verilmiş qadını ərindən boşatdıra bilər.

Qadın, ona elçi göndərənin dindar (müsəlman) və əxlaqlı olduğunu dəqiqləşdirməlidir. Əxlaqlı müsəlman kasıb olsa belə, əxlaqsız varlıdan daha xeyirlidir.

Qadın istəmədiyi adamın elçisini qaytardığına görə günah qazanmır.

Qohuma və ya qeyrisinə ərə getməkdə məhdudiyyət yoxdur. Belə ki, Əli ibn Əbu Talibin həyat yoldaşı öz qohumu - əmisi nəvəsi idi.

## Ərin öz qadını üzərində olan haqları

- Qadın öz əri ilə gözəl rəftar etməlidir.
- Ona xidmət etməlidir.
- Namusunu qorumalıdır.
- Ərinin izni olmadan evinə heç kimi buraxmamalıdır.

- Ərinin izni olmadan evdən çölə çıxmamalıdır.
- Ərinin izni olmadan malından heç kimə verməməlidir.
- Müstəhəb olan ibadətləri ərinin icazəsi ilə yerinə yetirməlidir. (Məsələn: əri onunla yaxınlıq etmək istəyəndə tutduğu nafilə orucunu pozmalıdır);
- Ərinə yalan danışmamalıdır.
- Əri ondan haram olan şeyləri tələb etdikdə, ona tabe olmamalıdır.
- Ərinin sirrini heç kəsə deməməlidir.

## Aşağıdakı hallarda cinsi əlaqəyə girmək haramdır

- Ramazan orucunu tutduqda;
- Etikafda olduqda;
- Həcc və ümrə ziyarəti üçün ehrama daxil olduqda;
- Heyz və nifas hallarında;
- Cinsi əlaqəyə girməməyə and içdikdə;
- Müvəqqəti nikahla. Uca Allah buyurub: "O kəslərdir ki, öz cinsi orqanlarını *həmişə* qoruyurlar, zövcələri və sahib olduqları cariyələr istisnadır. Onlar *buna görə heç* qınanmazlar. Bundan artığına can atanlarsa həddi aşanlardır."[1] İmam Əli (r.a.) rəvayət edir ki, Peyğəmbər ﷺ Xeybər günü müvəqqəti nikaha girməyi və ev eşşəyinin ətini yeməyi haram buyurdu.
- Bir yataqda iki arvadla cinsi əlaqəyə girmək;

[1] əl-Muminun, 5-7.

- Boşanmaq niyyəti ilə evləndikdə (yəni kəbin kəsildikdə, nə zaman boşanacağına niyyət edərsə). Peyğəmbərimiz ﷺ buyurub ki: "Bizi aldadan bizdən deyildir". Həm də heç bir kişi öz bacısının, qızının və başqa əzizlərinin bir müddət oynadılıb sonra atılmasına razı olmaz. Hətta qız əvvəlcədən oğlanın bu pis niyyətini bilsə, ona ərə getməyə razılıq verməməlidir.

Qadın zərurət halında cinsi əlaqədən imtina edə bilər. Səbəbsiz ərinə imtina edən qadın günah qazanmış olur.

Hamilə qadının cinsi əlaqəyə girməsi caizdir.

Qadına cinsi əlaqədə taqəti çatmadığı şeyi əmr etmək olmaz.

Qadın ərinin bədəninin istədiyi yerinə baxa bilər. Bunun üçün heç bir məhdudiyyət yoxdur.

Qadınla arxadan (anusdan) cinsi əlaqəyə girmək haramdır.

Ər öz qadınından dörd aydan artıq ayrı qalmamalıdır.

Qadının ərinə səbəbsiz olaraq yalan danışması haramdır.

Dünya malına görə həyat yoldaşı ilə pis rəftar etmək olmaz.

Qadının hər hansı səbəbə görə ərinə lənət etməsi haramdır.

Müsəlman qadını qeyri müsəlmana ərə vermək haram, kəsilən kəbin isə batildir.

Zinakarla evlənmək və ya zinakara ərə getmək haramdır. Lakin tövbə etdikdən sonra bunu etmək olar.

Qadın ərinə asi olduqda, əri ona nəsihət verməlidir. Nəsihət qəbul etməzsə, səhvini düzəldənə qədər qadını (yatağını ayırmaqla) tərk etməlidir.

Valideyn övladının evlənməsinə mane olarsa günah qazanmış olar. Bu halda valideynə itaət etmək olmaz.

Əri itkin düşmüş qadın bir müddət gözlədikdən sonra ərinin qayıtmayacağını yəqinləşdirib ərə getsə, heç bir günah qazanmaz.

## Talaq ilə əlaqəli şəriət hökmləri

Səbəbsiz olaraq boşamaq və ya boşanmaq haramdır.

Qadın bilməlidir ki, ərinin onu boşamayıb islah etməsi, onun üçün daha xeyirlidir. Qadın Allaha, Onun rəsuluna və ərinə (Allah və rəsuluna asi olmayan əmrlərdə) itaət etməzsə, əri onu islah etməlidir.

Qadını necə islah etməyi Uca Allah Quranda buyurub: "Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin, yataqda onları tərk edin və onları döyün! Əgər sizə itaət etsələr, onlara *əziyyət vermək üçün başqa* yol axtarmayın. Həqiqətən, Allah Ucadır, Böyükdür."[1] "Yataqda onları tərk edin" – yəni, onlarla bir yerdə yatıb, cinsi əlaqəyə girməyin, onları əzizləməyin. "Döyün" – yəni, üzə vurmamaq və vurulan yerləri sındırmamaq, əzməmək şərti ilə döymək. Bunun da faydası olmadıqda, qadın və kişi tərəfdən iki nəfər, onların bir-birinə olan münasibətlərini islah etmək üçün seçilməlidir. Uca Allah buyurur: "Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, onda kişinin ailəsindən bir hakim və qadının ailəsindən bir hakim göndərin. Əgər

---

[1] ən-Nisa, 34.

bunlar islah etmək istəsələr, Allah da onları barışdırar. Həqiqətən, Allah Biləndir, *hər şeydən* Xəbərdardır."[1] Bunun da bir faydası olmasa onların boşanması, bir-birinə nifrət edərək bir yerdə yaşamaqlarından daha xeyirlidir.

Qadının boşanmasının caiz olmadığı hallar:

- Heyz və nifas olduqda;
- Boşayan kişinin ağlı başında olmadıqda (içkili, nəşəli, hirsli və s. hallarda).

Qadına "səni boşadım" deyən kişi, boşanma müddəti tamam olmazdan əvvəl onunla cinsi əlaqəyə girərsə, talaq batil olur.

Boşanmış qadının gözləmə müddəti haqqında Uca Allah buyurur : "Boşanmış qadınlar üç heyz müddəti gözləməlidirlər."[2] Yəni, əri ona heyz və nifas olmadığı halda "səni boşadım" dedikdən sonra, iki dəfə heyz olub ondan təmizlənənə qədər gözləməlidir. (Hər dəfə heyzdən təmizləndikdə əri ona "səni boşadım" deməlidir).

Boşanmanın səbəbləri aşağıdakılar ola bilər:

- Ərlə arvadın arasında olan məhəbbətin azalması;
- Cinsi əlaqədə birinin o birisini qane etməməsi;
- Qadının ərinə itaət etməməsi;
- Qadının əri ilə kobud rəftar etməsi;
- Ərin qadına zülm və insafsızlıq etməsi və onunla kobud rəftar etməsi;

Nikahın hökmü aşağıdakı hallarda ləğv edilə bilər:

- Talaq vermək;

---

[1] ən-Nisa, 35.
[2] əl-Bəqərə, 228.

- Ər və ya arvadın kafir olması;
- Ər və ya arvadın ölməsi;
- Uzunmüddətli səfərdə olan kişi bilərəkdən evinə qayıtmırsa;
- Ər və ya arvad itkin düşmüşsə;

Valideynin övladına "arvadını boşa" deməsi iki halda ola bilər:

- Qadının kafir və ya fasiq yaxud da zinakar olduğuna görədirsə, valideynə itaət edib arvadı boşamaq vacibdir;
- Dünyəvi səbəblərə görə isə qadını boşamaq vacib deyil;

Qadın ərinin ona verdiyi mehri qaytarıb, ərindən boşanmasını tələb edə bilər. Bu halda valideynlərin razılığı şərt deyil.

Kişi arvadı ilə yaxınlıq etməyi nəfsinə haram etmişsə, etdiyi bu günahın kəffarəsini verməyincə arvadı ilə yaxınlıq etməsi haramdır. Kişinin etdiyi bu əməl *zihar* adlanır. Onun kəffarəsi barədə Uca Allah Quranda buyurub: "Qadınlarını *anaya bənzədərək* özlərinə haram edib, sonra sözlərini geri götürənlər onlarla yaxınlıq etməzdən əvvəl bir kölə azad etməlidirlər. Bu sizə verilən öyüd-nəsihətdir. Allah nə etdiklərinizdən xəbərdardır. *Buna imkan* tapa bilməyən kəs, qadını ilə yaxınlıq etməzdən əvvəl iki ay ardıcıl oruc tutmalıdır. Buna gücü çatmayan kimsə altmış yoxsulu yedirtməlidir. Bu sizin Allaha və Onun Elçisinə iman gətirməniz üçündür. Bunlar Allahın hüdudlarıdır. Kafirləri isə sarsıdıcı bir əzab gözləyir."[1]

---

[1] əl-Mucadilə, 3-4.

Zihar talaqdan sayılmır. Çünki talaq etmiş kişi qadını ilə cinsi əlaqəyə girmək üçün yenidən kəbin kəsməlidir. Lakin, zihar etmiş kişi yuxarıdakı ayədə qeyd olunmuş üç şeydən birini etdikdən sonra qadını ilə cinsi əlaqəyə girə bilər.

Qadın əri ilə yaxınlıq etməyi nəfsinə haram etmişsə, etdiyi günahın kəffarəsini bir qul azad etmək və ya on kasıb yedirtmək və ya üç gün ardıcıl oruc tutmaqla verməlidir. Lakin əri istədiyi vaxt (qadın etdiyi işin müqabilində kəffarə verdikdən əvvəl və ya sonra) onunla cinsi əlaqəyə girə bilər. Çünki ayə yalnız kişilər üçün nazil olub.

## Qadın ərinin vəfatından sonra nə etməlidir

- Evində oturmalı və ancaq zərurət halında bayıra çıxmalıdır;
- Bəzənməməlidir;
- Dörd ay on gün gözləyib ərə getməməlidir.
- Qara paltar geyinməyi xüsusiləşdirməməlidir.

## Əmizdirmək ilə əlaqəli şəriət hökmləri

Uşağı iki il əmizdirmək. Uca Allah buyurur: “Analar öz övladlarını tam iki il əmizdirsinlər. *Bu,* əmizdirməni tamamlamaq istəyənlər üçündür.”[1]

Qadın hər hansı bir oğlan uşağını iki yaşına qədər beş dəfə əmizdirərsə, həmin uşaq onun məhrəmi sayılar.

---

[1] əl-Bəqərə, 233.

Qadın hər hansı bir uşağı iki yaşından sonra əmizdirərsə, həmin uşaq onun məhrəmi sayılmaz.

Zərurət olmadığı halda qadını uşağı əmizdirməyə məcbur etmək olmaz.

Eyni vaxtda iki süd bacıları ilə evlənmək haramdır.

Oğlan uşağını onu əmizdirən qadına və onun qızlarına və ya qız uşağını onu əmizdirənin oğlanlarına məhrəm edən əmizdirmənin şərtləri:

- İki yaşına qədər əmizdirməli. Belə ki, iki ildən sonra əmizdirilən uşaq məhrəm sayılmır.
- Beş dəfə qadının döşündən süd əmməli. Çünki beş dəfədən az əmməklə uşaq məhrəm sayıla bilməz.

Uşağın nəfəs almaq üçün və ya doyduqdan sonra qadının döşünü tərk etməsi bir dəfə əmmək sayılır. Bunun üçün döşdə südün olması şərtdir.

## Uşaqların tərbiyəsi ilə əlaqəli şəriət hökmləri

Fasiq kişi və ya qadın uşaqlarının tərbiyəsi ilə məşğul ola bilər. Həmçinin, fasiq kişi ərə verdiyi qızının vəlisi dura bilər.

Uşağın tərbiyəsi ilə adətən ana məşğul olur. Lakin doğrusu odur ki, valideynlərin hansı birisi uşağa daha çox qayğı göstərə bilərsə o da, uşağın tərbiyəsi ilə məşğul olmalıdır. Çünki elə qadınlar var ki, uşağını bir-iki il tərbiyə etdikdən sonra onu yetimlər evinə atır və onu tamam unudur.

# Övladlığa götürmə barəsində

Oğulluğa və ya qızlığa götürülmüş uşağı atasından başqa heç kəsə mənsub etmək olmaz. Peyğəmbər ﷺ Zeyd ibn Harisi oğulluğa götürmüşdü. Buna görə də ona Zeyd ibn Muhəmməd deyirdilər. Sonra Uca Allah bunu qadağan etdi: "Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir."[1]

Kişi və ya qadın vəfat etdikdə, mal-dövlətinin üçdən bir hissəsini və ya ondan azını oğulluğa və ya qızlığa götürdüyü uşağa hədiyyə verə bilər.

Oğulluğa və qızlığa götürülmüş uşaq, vəlisi vəfat etdikdən sonra onun mal-dövlətinə varis ola bilməz.

Uşaq varislərdəndirsə ölənin mirasından ona da düşür.

Kişi oğulluğa götürdüyü uşağın arvadı ilə, yalnız oğulluğu onu boşadıqdan sonra evlənə bilər. Zeyd ibn Haris arvadı Zeynəbi boşadıqdan sonra Peyğəmbər ﷺ onunla evlənmişdir: "Zeyd zövcəsini boşadıqda səni onunla evləndirdik ki, oğulluqları övrətlərini boşadıqları zaman *o qadınlarla evlənməkdə* möminlərə heç bir sıxıntı olmasın. Allahın əmri mütləq yerinə yetəcəkdir."[2]

Kişiyə doğma oğlunun boşadığı arvadı alması haramdır. Uca Allah buyurur: "Sizə... öz belinizdən gələn oğullarınızın arvadları *ilə evlənmək*... haram edildi."[3]

Yalnız aşağıdakı hallarda hər hansı şəxsi atasından qeyrisinə mənsub etmək olar:

---

[1] əl-Əhzab, 40.
[2] əl-Əhzab, 37.
[3] ən-Nisa, 23.

- Əzizləmək məqsədilə kiməsə “oğlum” deyə müraciət etmək olar.
- Məcburiyyət qarşısında.

Atası məlum olmayan uşaq anasına mənsub olunmalıdır.

## Matəmlə bağlı şəriət hökmləri

Əri vəfat edən qadına ətirlənmək, bəzənmək, səfərə çıxmaq, qara geyinməyi xüsusiləşdirmək və ənlik-kirşandan istifadə etmək caiz deyil.

Qadın dörd ay on gün gözlədikdən sonra yuxarıda qadağan olan şeyləri istifadə edə bilər. Həmçinin, bu müddətdən sonra ərə də gedə bilər.

Qadına 4 ay 10 gündən artıq ər üçün yas saxlamaq qadağandır. Çünki buna Allah Özü hədd qoymuşdur: “Sizlərdən ölənlərin qoyub getdiyi zövcələr dörd ay on gün gözləməlidirlər.”[1]

Hamilə qadına, hamiləlikdən azad olmayınca ərə getmək haramdır.

Zərurət halında (ruzi, xəstəlik və ya bu kimi səbəblərə görə) evdən bayıra çıxmaq olar. Bu halda qadın evdən çıxdıqda qadağan olan şeylərdən – kosmetika, ətir və başqa bu kimi cəlb edici şeylərdən çəkinməlidir.

Həcc ziyarəti üçün evdən çıxmaq zərurətdən sayılmır.

[1] əl-Bəqərə, 234.

## And içməklə əlaqəli şəriət hökmləri

Qadın müəyyən bir şəxsə ərə getməməyi qəsdən and içdikdən sonra həmin şəxsə ərə getsə, cərimə olaraq bunun kəffarəsini ödəməlidir. Qul azad etməli və ya on kasıb yedirtməli və ya üç gün ardıcıl oruc tutmalıdır.

## Nəzir ilə əlaqəli şəriət hökmləri

Nəzir demək bəyənilmir.
Nəzir insan üçün yazılmış qədəri dəyişdirmir.
Nəzir etmiş insan onu yerinə yetirməlidir.
Nəzir yalnız Allah üçün olmalıdır.

## Uşaqların tərbiyəsi ilə əlaqəli şəriət hökmləri

On yaşına çatmış oğlan və qız uşaqlarının yataqlarını ayırmaq vacibdir.

Anadan olan oğlan uşağı üçün iki, qız uşaqları üçün isə bir qoç kəsmək Peyğəmbərin ﷺ vacibə yaxın olan sünnəsindəndir. Bu əməl uşağın anadan olduğu gündən yeddi gün sonra olmalıdır.

Uşaqların birini o birisindən üstün tutmaq caiz deyil. Peyğəmbər ﷺ demişdir: "Allahdan qorxun və övladlarınıza qarşı ədalətli olun".

Qız uşağına yeddi yaşından həddi-buluğa çatana qədər hicab geymək bəyənilən əməllərdəndir. Bu, uşağın həddi-buluğa çatdıqdan sonra müntəzəm olmasına müsbət təsir göstərir.

Uşaqları məscidə aparmaq caizdir.

Qəzəbləndikdə uşaqları lənətləmək və ya onlar üçün bəd dua etmək haramdır. Bu halda onları söymək bəyənilmir. Çünki bu, onların tərbiyəsinə mənfi təsir göstərir.

## Valideynlərə qayğı barəsində

Uca Allah buyurur: "Rəbbin yalnız Ona ibadət etməyi və ata-ana ilə yaxşı davranmağı buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında qocalıq yaşına dolarsa, onlara: "Uf!" belə demə, üstlərinə qışqırma və onlara xoş söz söylə!"[1]

Övlad anaya daha çox qayğı göstərməlidir. Əbu Hureyra (r.a) rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın elçisi! Mən kimə qayğı göstərməliyəm?" O dedi: "Anana!" Yenə soruşdular: "Sonra kimə?" O dedi: "Anana!" Bir də soruşdular: "Sonra kimə?" O dedi: "Anana!" (Dördüncü dəfə): "Sonra kimə?" - dedikdə, o: "Atana!" - dedi.

Qadın əri ilə onun valideynləri və ya əri ilə qardaşının valideynləri arasında olan anlaşılmazlıqlarda, yalnız haqqın tərəfini tutmalıdır.

İnsan hər hansı bir şəxsə nifrət etdiyinə görə, ona qarşı ədalətsizlik etməməlidir. Uca Allah buyurur: "Ey iman gətirənlər! Allah xatirinə ədaləti qoruyan şahidlər olun. *Hər hansı bir* camaata qarşı olan kin-küdurət sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun! Bu, təqvaya

---

[1] əl-İsra, 23.

daha yaxındır. Allahdan qorxun! Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır."[1]

Qadın həm öz valideynlərinə, həm də ərinin valideynlərinə şəriətə müxalif olmayan şeylərdə itaət etməlidir.

Qadını dünyəvi işlərdə bacarmadığı şeyi etməyə məcbur etmək zülmdür. Zülm etmək isə haramdır. Uca Allah qüdsi hədisdə buyurur: "Ey qullarım! Mən zülmü nəfsimə haram etdim və sizin də aranızda onu (bir-birinizə zülm etməyi) haram etdim. Bir-birinizə zülm etməyin..."

Valideynlər vəfat etdikdən sonra tərk etdiyi saleh övladın etdiyi yaxşı əməllərin savabından onlara da yazılır.

Ata öz övladına anaya qarşı pis münasibət bəsləməyi əmr etsə, övlad buna itaət etməməlidir.

Qohumluq əlaqələrini kəsmək haramdır. Buna görə də kişinin arvadına qohumluq əlaqələrini kəsməyi əmr etməsi haramdır. Yalnız zərurət halında bunu etmək olar.

Valideynlər Allaha asi olsalar, onları hikmətlə başa salmaq lazımdır. Düz yola gəlməkdən boyun qaçırsalar, onlara qəzəblənmək və nifrət etmək olmaz. Çünki hidayət Allahın Əlindədir. Uca Allah buyurur: "Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir. O, doğru yolda olanları da daha yaxşı tanıyır."[2]

---

[1] əl-Maidə, 8.
[2] əl-Qəsəs, 56.

Lakin bununla belə onlar üçün dua etmək lazımdır ki, Allah onlara hidayət versin. Əbu Hureyra (r.a.) başına gələn əhvalatı hekayət edərək deyir: "Mən anamı İslam dininə dəvət edirdim. O, isə bunu inkar edirdi. Bir gün yenə dəvət etdikdə, anam Peyğəmbər ﷺ haqqında nalayiq sözlər dedi. Mən ağlaya-ağlaya Peyğəmbərin ﷺ yanına gedib başıma gələnləri ona danışdım. Sonra da ondan: "Ey Allahın elçisi! Allaha dua et ki, Əbu Hureyranın anasını doğru yola yönəltsin" deyə xahiş etdim. O, dua edib dedi: "Allahım! Əbu Hureyranın anasına hidayət ver!" Peyğəmbər ﷺ dua edəndən sonra mən sevincək evə qayıtdım. Qapıya çatanda anam mənə: "Yerində dur, ey Əbu Hureyra!" - dedi. Anam qüsl edib paltarını geyindikdən sonra bayıra çıxdı və üzünü mənə tutub dedi: "Əşhədu ən lə ilahə illəllah və əşhədu ənnə Muhəmmədən Rəsulullah". Mən bu dəfə sevincimdən ağlayaraq Peyğəmbərin ﷺ yanına gəlib ona dedim: "Ey Allahın elçisi! Uca Allah sənin duanı qəbul etdi və Əbu Hureyranın anasına hidayət verdi."

## Əməl olunması vacib olan digər şəriət hökmləri

Vəfat etmiş qadını öz əri və yaxud hər hansı bir başqa qadın yuya bilər. Əri olmayan qadının məhrəmlərindən biri tərəfindən yuyulması qəti qadağandır.

Qeybət etmək haramdır.

Qadınların ən şərlisi ikiüzlü olanıdır.

Qadına ərinin ona etdiyi yaxşılıqları puç edib, "Sən mənə nə yaxşılıq etmisən ki?" – deyərək nankor olması

haramdır. Peyğəmbər ﷺ bu səbəbə görə Cəhənnəm əhlinin əksəriyyətinin qadınlar olacağı barədə xəbər vermişdir.

Qadın ona naməhrəm olan mömin bir şəxsə şəriət qanunları ilə xitab edə bilər. Allah buyurur: "Mömin kişilərlə mömin qadınlar bir-birinin dostlarıdır. Onlar *insanlara* yaxşı işlər görməyi buyurur, pis əməllərə qadağa qoyur, namaz qılır, zəkat verir, Allaha və Onun Elçisinə itaət edirlər. Allah onlara rəhm edəcəkdir. Həqiqətən, Allah Qüdrətlidir, Müdrikdir."[1]

Üzrsüz uşaq saldırmaq haramdır. Ana bətnindəki uşaq onun həyatı üçün təhlükəli olarsa, uşağı tibdə məlum olan üslubla ananın bətnindən çıxartmaq olar.

Qadın müalicə üçün yalnız qadın həkiminə müraciət etməlidir. Qadın həkim olmadığı təqdirdə kişi həkiminə müraciət etmək olar. Bir şərtlə ki, qadının yanında məhrəmi olmalıdır. Bunu da yalnız qadın həkim olmadığını yəqinləşdirdikdən sonra etmək olar.

Qadının qurban kəsməsi caizdir.

[1] ət-Tövbə, 71.